**UOT 619:576.89; 619:616.995.1**

# EV TOYUQLARINDA İNVAZİON XƏSTƏLİKLƏRİN YAYILMA XÜSUSİYYƏTLƏRİ

**S.Ə.MƏMMƏDOVA**
**AKTN Baytarlıq ET İnstitutu**

*Məqalədə Qəbələ və Şəki rayonlarının fermer quşçuluq təsərrüfatlarında invazion xəstəliklərə görə aparılmış tədqiqat işlərindən bəhs edilir. Qəbələ və Şəki rayonları ərazilərindəki təsərrüfatlarda ev toyuqlarında eymerioz, askaridioz, heterakidozla assosiativ yoluxmanın ekstensivliyi və intensivliyi müəyyən olmuşdur.*

*Qəbələ rayonunda 1-ci təsərrüfat üzrə yoluxma eymeriozla 27,6%, askaridiozla 34,3%, heterakidozla 27,6%, rayonun digər təsərrüfatında isə eymeriozla 22,5%, askaridiozla 21,6%, heterakidozla 22,5% assosiativ yoluxmanın baş verməsi müayinələr nəticəsində müəyyənləşdirilmişdir. Şəki rayonunda təsərrüfat üzrə yoluxma eymeriozla 30,8%, askaridiozla 18,8%, heterakidozla 14,4% təşkil etmişdir.*

***Açar sözlər:*** *quş, yoluxma, müayinə, eymerioz, helmintoz, ekstensivlik, intensivlik*

Respublikada həyata keçirilən geniş miqyaslı layihələrdən biri də ərzaq təhlükəsizliyi və əhalinin kənd təsərrüfatı məhsullarına olan tələbatını ödəməkdir. Dövlət tərəfindən həyata keçirilən bu proqramlara əsasən əhalinin vaxtında və yüksək keyfiyyətli məhsullarla təmin edilməsi nəzərdə tutulur. Bu layihələrin həyata keçirilməsində əsas məqsəd sənaye əsaslı quşçuluq təsərrüfatlarının yaradılması, yeni quş cinslərinin, onların yemlənmə və saxlanma şəraitinin inkişaf etdirilməsidir.

Quşçuluq təsərrüfatlarının intensiv inkişaf etdirilməsinə maneçilik törədən bir sıra səbəblər vardır. Bu səbəblərdən biri də quşlar arasında baş verən invazion xəstəliklərdir (1,2,3).

İnvazion xəstəliklərin törədiciləri quşların daxili orqan və toxumalarında parazitlik edən orqanizmin müxtəlif toxumalarının və mədə-bağırsaqda həzm olunan qida hesabına yaşayaraq, parazit həyat sürürlər. Onlar orqanizmə toksiki və mexaniki təsir edir, maddələr mübadiləsinin pozulmasına, daxili orqanların zədələnməsinə, iltihabların, nekrozlaşmanın, bağırsaqda keçilməməzliyin, tıxanmanın və sair bu kimi patoloji proseslərin baş verməsinə səbəb olurlar. Helmintlərin təsirindən bağırsaq divarının, orqan və toxumaların zədələnməsi nəticəsində infeksiyaya yol açılır və yoluxucu xəstəliklərin baş verməsinə əlverişli şərait yaranır. Bununla əlaqədar olaraq invazion xəstəliklərinin quşlar arasında öyrənilməsinin böyük elmi və praktiki əhəmiyyəti vardır (4,5).

Tədqiqatlarda məqsəd ev quşlarının invazion xəstəliklərinin epizootoloji vəziyyətini müəyyənləşdirmək olmuşdur.

**Material və metodlar.** Tədqiqatlar 2018-ci ildə Qəbələ və Şəki rayonlarının fermer quşçuluq təsərrüfatlarından toplanmış materiallar əsasında BETİ-nin parazitologiya şöbəsində yerinə yetirilmişdir.

Ev toyuqlarının assosiativ bağırsaq parazitlərini (eymeriya, askarid, heterakis) öyrənmək məqsədilə Qəbələ rayonunun fermer quşçuluq təsərrüfatlarından döşəmə şəraitində saxlanan quşlardan 3, 6 və 12 aylıq yaş qruplarından 225 ədəd kal nümunələri toplanmışdır.

Şəki rayonunun fermer quşçuluq təsərrüfatlarından 30, 60, 90 günlüklər saxlanan qruplardan 480 ədəd kal nümunələri toplanaraq müayinə edilmişdir.

Ümumiliklə, 705 ədəd kal nümunələrinin laboratoriya şəraitində tədqiqi əsasında quşların eymeriya oosistaları və helmint yumurtaları ilə yoluxması müəyyənləşdirilmişdir. Kal nümunələri Fülleborn və Vişnyauskas üsulları ilə müayinə edilmiş və nəticədə helmintozlardan askaridiozun törədicisi - *Ascaridia galli* və heterakidozun törədicisi *Heterakis gallinarum*-un yumurtaları, təthüceyrəli parazitlərdən isə eymeria oosistaları - *E. tenella, E.acervulina, E.maxima, E.mitis* müəyyən edilmişdir.

Aparılan tədqiqatlar zamanı koproloji müayinə ilə yanaşı natamam helmintoloji yarma müayinəsi də aparılmışdır. Qəbələ rayonunun fermer quşçuluq təsərrüfatlarında 75 başda, Şəki rayonunun fermer quşçuluq təsərrüfatlarında isə 90 başda aparılmışdır.

**Alınan nəticələr və onların müzakirəsi.** Qəbələ və Şəki rayonlarının fermer təsərrüfatlarında ev toyuqlarının eymeriya, askarid, heterakis ilə yoluxması quşların yaşından asılılığı aparılan tədqiqatlar nəticəsində müəyyən edilmişdir.

Qəbələ rayonunun fermer təsərrüfatlarında ev toyuqlarının eymerioz, askaridioz, heterakidozla yoluxması aşkar edilmişdir. Bu təsərrüfatda 3 aylıqlar arasında eymeriozla yoluxma 34,3%, askaridiozla 40,0%, heterakidozla 31,4% yoluxma aparılan koproloji müayinələr nəticəsində aşkar olunmuşdur. 6 aylıqlar arasında eymeriozla 31,4%, askaridiozla

34,3%, heterakidozla 28,6% yoluxma müəyyən edilmişdir. Müayinə aparılan təsərrüfatda 12 aylıqlar arasında eymerioz, askaridioz və heterakidozla assosiativ yoluxma müvafiq olaraq 17,1%, 28,6%, 22,8% təşkil etmişdir.

Qəbələ rayonunun digər fermer təsərrüfatlarında 3 aylıqlar arasında eymeriozla yoluxma 27,5%, askaridiozla 25,0%, heterakidozla 20,0%, 6 aylıqlar arasında isə eymeriozla 25,0%, askaridiozla 22,5%, heterakidozla 25,0% yoluxma müəyyən edilmişdir. Müayinə aparılan təsərrüfatda 12 aylıqlar arasında eymerioz, askaridioz və heterakidozla assosiativ yoluxma müvafiq olaraq 15,0%, 17,5%, 17,5% təşkil etmişdir (Cədvəl 1).

**Cədvəl 1**

**Ev toyuqlarının qarışıq invaziya ilə yoluxması ( %-lə )**

| Ev toyuqlarının yaşı | Müayinə edilmişdir | Eymerioz | | Askaridioz | | Hetera-kidoz | |
|---|---|---|---|---|---|---|---|
| | | Yoluxmuşdur | Yoluxma faizi | Yoluxmuşdur | Yoluxma faizi | Yoluxmuşdur | Yoluxma faizi |
| Qəbələ rayonu 1-ci təsərrüfat | | | | | | | |
| 3 aylıq | 35 | 12 | 34,3 | 14 | 40,0 | 11 | 31,4 |
| 6 aylıq | 35 | 11 | 31,4 | 12 | 34,3 | 10 | 28,6 |
| 12 aylıq | 35 | 6 | 17,1 | 10 | 28,6 | 8 | 22,8 |
| Təsərrüfat üzrə | 105 | 29 | 27,6 | 36 | 34,3 | 29 | 27,6 |
| Qəbələ rayonu 2-ci təsərrüfat | | | | | | | |
| 3 aylıq | 40 | 11 | 27,5 | 10 | 25,0 | 8 | 20,0 |
| 6 aylıq | 40 | 10 | 25,0 | 9 | 22,5 | 10 | 25,0 |
| 12 aylıq | 40 | 6 | 15,0 | 7 | 17,5 | 7 | 17,5 |
| Təsərrüfat üzrə | 120 | 27 | 22,5 | 26 | 21,6 | 27 | 22,5 |

Qəbələ rayonunda 1-ci təsərrüfat üzrə yoluxma eymeriozla 27,6%, askaridiozla 34,3%, heterakidozla 27,6%, rayonun digər təsərrüfatında isə eymeriozla 22,5%, askaridiozla 21,6%, heterakidozla 22,5% assosiativ yoluxmanın baş verməsi müayinələr nəticəsində müəyyənləşdirilmişdir.

Yarma müayinəsi zamanı nematodlardan askaridi, heterakis aşkar olunmuşdur. Belə ki, helmintlərdən askaridi 4-32 ədəd, heterakis 3-23 ədəd olduğu müəyyən edilmişdir. Həmçinin bağırsaqlarda eymeriya ocaqlarına (qan sağıntılarına) rast gəlinmişdir (Cədvəl 2).

**Cədvəl 2**

**Yarma müayinəsinin nəticələri**

| Yaşı | Müayinə edilmişdir | *Ascaridia galli* | | *Heterakis gallinarum* | |
|---|---|---|---|---|---|
| | | Yoluxmuşdur | İnvaziyanın intensivliyi | Yoluxmuşdur | İnvaziyanın intensivliyi |
| 6 aylıq | 25 | 14 | 6-32 | 13 | 4-23 |
| 9 aylıq | 25 | 16 | 5-21 | 17 | 3-19 |
| Yaşlılar | 25 | 18 | 4-16 | 20 | 3-12 |
| Cəmi | 75 | 48 | 4-32 | 50 | 3-23 |

Şəki rayonunun fermer təsərrüfatlarında ev toyuqlarının eymerioz, askaridioz, heterakidozla yoluxması aşkar edilmişdir. Bu təsərrüfatda 30 günlüklər arasında eymeriozla yoluxma 44,4%, askaridioz və heterakidozla yoluxma aparılan koproloji müayinələr nəticəsində aşkar olunmamışdır. 60 günlüklər arasında eymeriozla 29,4%, askaridiozla 24,4%, heterakidozla 20,0% yoluxma müəyyən edilmişdir. Müayinə aparılan təsərrüfatda 90 günlüklər arasında eymerioz, askaridioz və heterakidozla assosiativ yoluxma müvafiq olaraq 18,8%, 32,0%, 23,1% təşkil etmişdir. Cəmi yoluxma eymeriozla 30,8%, askaridiozla 18,8%, heterakidozla 14,4% yoluxma müəyyən edilmişdir. (Cədvəl 3).

Şəki rayonunda təsərrüfat üzrə yoluxma eymeriozla 30,8%, askaridiozla 18,8%, heterakidozla 14,4% təşkil etmişdir.

Cədvəl 3

Ev toyuqlarının qarışıq invaziya ilə yoluxması ( %-lə )

| Ev toyuqlarının yaşı | Müayinə edilmişdir, (baş) | Eymerioz | | Askaridioz | | Heterakidoz | |
|---|---|---|---|---|---|---|---|
| | | Yoluxmuşdur | Yoluxma faizi | Yoluxmuşdur | Yoluxma faizi | Yoluxmuşdur | Yoluxma faizi |
| Şəki rayonu | | | | | | | |
| 30 günlük | 160 | 71 | 44,4 | - | - | - | - |
| 60 günlük | 160 | 47 | 29,4 | 39 | 24,4 | 32 | 20,0 |
| 90 günlük | 160 | 30 | 18,8 | 51 | 32,0 | 37 | 23,1 |
| Cəmi | 480 | 148 | 30,8 | 90 | 18,8 | 69 | 14,4 |

Yarma müayinəsi zamanı nematodlardan askaridi, heterakis aşkar olundu. Belə ki, helmintlərdən askaridi 4-30 ədəd, heterakis 4-23 ədəd olduğu müəyyən edilmişdir. Həmçinin bağırsaqlarda eymeriya ocaqlarına (qan sağıntılarına) rast gəlinmişdir (Cədvəl 4).

**Cədvəl 4**

**Yarma müayinəsinin nəticələri**

| Yaşı | Müayinə edilmişdir | *Ascaridia galli* | *Heterakis gallinarum* |
|---|---|---|---|
| | | İnvaziyanın intensivliyi | İnvaziyanın intensivliyi |
| 3 aylıq | 30 | 5-30 | 6-23 |
| 6 aylıq | 30 | 5-22 | 5-16 |
| 12 aylıq | 30 | 4-16 | 4-15 |
| Cəmi | 90 | 4-30 | 4-23 |

**Nəticə:**

1. Qəbələ rayonunda 1-ci təsərrüfat üzrə yoluxma eymeriozla 27,6%, askaridiozla 34,3%, heterakidozla 27,6%, rayonun digər təsərrüfatında isə eymeriozla 22,5%, askaridiozla 21,6%, heterakidozla 22,5% assosiativ yoluxmanın baş verməsi müayinələr nəticəsində müəyyənləşdirilmişdir.
2. Şəki rayonunda təsərrüfat üzrə yoluxma eymeriozla 30,8%, askaridiozla 18,8%, heterakidozla 14,4% təşkil etmişdir.

## ƏDƏBİYYAT

1.Musayev M.Ə., Hacıyev A.T., Yolçuyev Y.Y., Vahidova S.M., Mustafayeva Z.Ə. Azərbaycanda ev quşlarının parazitləri və onlara qarşı mübarizənin elmi əsasları. Bakı, Elm, 1991, səh. 54-71. 2. Məmmədov İ.B. Naxçıvan Muxtar Respublikası şəraitində ev toyuqlarının assosiativ invaziyaları // AMEA Naxçıvan Bölməsi Xəbərlər, Təbiət və texniki elmlər seriyası, Naxçıvan: Tusi, 2011, № 4, səh. 178-182. 3.Yolçuyev Y.Y., Məmmədova S.Ə. Abşeronda ev toyuqlarının eymeriozları və qarışıq invaziyalar. Zoologiya institutunun əsərləri, XXVIII cild, Bakı, "Elm", 2006, səh. 912 - 917. 4.Özlem O., Kamile B. Van yöresi tavuklarında paraziter fauna tesbiti// Türkiye Parazitoloji Dergisi, 2009, c. 33, № 22, səh.162-164. 5. Миронова А. А. Патологоанатомические изменения у цыплят при ассоциации эймериоз-капилляриоз-аскаридиоз. Сб.науч.трудов, посвященных 80-летию создания первой в России кафедры паразитологии имени академика К. И. Скрябина, Персиановка, 1997, стр. 79-81.


### Осовенности распространения инвазионных заболеваний домашних кур


**С.А.Мамедова**



В статье излагаются результаты проведенных исследований на инвазионные заболевания в птицеводческих хозяйствах Габалинского и Шекинского районов. На территории указанных районов у домашних птиц зарегистрирована ассоциация эймериоза, аскаридиоза и гетеракидоза. По проведенным исследованиям у птиц в первом хозяйстве Габалинского района установлена ассоциация эймериозом 27,6%, аскаридиозом 34,3% и гетеракидозом 27,6%; во втором хозяйстве эймериозом 22,5%, аскаридиозом 21,6% и гетеракидозом 22,5%. У птиц Шекинского района зараженность эймериозом составляет 30,8%, аскаридиозом 18,8% и гетеракидозом 14,4%.



***Ключевые слова**: птица, заражение, исследование, эймериоз, гельминтоз, экстенсивность, интенсивность*


### Spreading features of invasion discases in birds


**S.A.Mammadova**



In the article deal with research work for invasion in farm of Qabala and Shakı region. In the territories of Gabala and Shakhı districts farms was determined the intensity and extensity of infection of poultry eymeriosis, ascaridiosis and geterakidosis.

During research has been identified associative infection with eymeriosis 27,6%, ascaridiosis 34,3%, heterakidosis 27,6% in first farm, with eymeriosis 22,5%, ascaridiosis 21,6%, heterakidosis 22,5% on other farms of destricts. In farms were detected infection with eymeriosis 30,8%, ascaridiosis 18,8%, heterakidosis 14,4% in Shaki.



***Keywords**: bird, contamination, inspection, eymeriosis, helmintosis, extensivity, intensivity.*